# MƏHDƏVİYYƏT VƏ QLOBALLAŞDIRMA


:Müəllif

Doktor Əliəsğər Rizvani



:Çap nəşriyyat

əl-Mustafa (s) Beynəlxalq Tərcümə və Nəşr mərkəzi

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

MƏHDƏVİYYƏT VƏ QLOBALLAŞDIRMA

**KİTAB HAQQINDA**

TəDQIQAT şőBəSI

KITABıN ADı: ..................... MəHDəVIYYəT Və QLOBALLAşDıRMA

MüəLLIF: ...................................................... ƏLIəSGəR RIZVANI

TəRCüMə EDəN: .................................. CəMALəDDIN ŎüKüROV

REDAKTOR: ......................................................... TOFIQ ƏSəDOV

KOMPüTERDə YığAN: ................................. ƏLəDDIN MəLIKOV

NAşIR: .................... BEYNəLXALQ əL-MüSTAFA(S) AKADEMIYASı

KORREKTOR:...................................... SEYID ÌVEYS HüSEYNI

ÇAP NöVBəSI: ................................................................ BIRINCI

TARIX: ............................................................................... ٢٠٠٨

TIRAJ: ............................................................................... ٢٠٠٠

ISBN: ..................................................... ٩٧٨-٩۶۴-١٩٥-٠١٧-٢

İNVAN: İRAN, QUM, BAHAR PROSPEKTI, BEYNəLXALQ əL-MüSTAFA(S) .AKADEMIYASıNıN NəşRIYYATı

TELFAX: ٠٠٩٨ ٢٥١ ٧٧۴٩٨٧٥

WWW.ESHRAAQ.COM

E-MAIL: PUBLIC-RELATIONS@QOMICIS.COM

## NAŞİRDƏN

Məhdəviyyət ideologiyası islahat və ədalət arzusunda olan insanların qədim tarixə malik müqəddəs inancıdır. Bu ideologiya bəşərin məlum olmayan sabahına aydınlıq bəxş etməklə yanaşı, müasir dünyagörüşündə də əvəz olunmaz rola malikdir. Çünki imam və rəhbərini tanımayan şəxs yolunu, hədəfini və vəzifəsini heç vaxt düzgün şəkildə istiqamətləndirə bilməz. Necə ki, bu mövzuya bir çox rəvayətlərdə də təkid .olunmuşdur

Sizə təqdim olunan _�MəHDəVIYYəT Və QLOBALLAşDIRMA�_ adlı bu kitab tanınmış tədqiqatçı alim Əliəsğər Rizvaninin qələmi ilə müqəddəs məhdəviyyət ideologiyasına baxış naminə fars dilində yazılımış, Beynəlxalq Əl-Müstafa(s) Akademiyasının tələbəsi CəMALəDDIN ŎüKüROV tərəfindən Azərbaycan dillinə tərcümə olunmuşdur. ÜDİEA tədqiqat şöbəsi hörmətli müəllifə, tərcüməçiyə və kitabın .işıq üzü görməsində zəhmət çəkmiş bütün şəxslərə dərin təşəkkürünü bildirir

Beynəlxalq əl-Müstafa(s) Akademiyası, tədqiqat şöbəsi ۲۰۰۸

səh:۵

**MÜNDƏRİCAT**

səh:۸

## MÜTƏRCİMDƏN

Müasir dövrün ümumbəşəri problemlər kompleksini həll edən cərəyana qloballaşma deyilir. Qloballaşmanı iqtisadi, mədəni, ictimai, hərbi və bu kimi müxtəlif sahələrdə :nəzərə almaq olar. Qloballaşma məsələsində əsaslı sual bundan ibarətdir

Qloballaşmanı idarə edən var? Yoxsa təbii şəkildə müxtəlif və rəngarəng iradələrin azad məhsuludur? Dünyaya aydın və açıq formada baxdıqda görürük ki, qloballaşma .həm təbii şəkildə, həmdə siyasətçilərin şüurunda formalaşaraq öz əksini tapır

Əlbəttə ilk öncə qloballaşma ilə qloballaşdırma arasında fərq qoymalıyıq. Qloballaşma cərəyanı təbii formada meydana gələn bir predmetdir. Amma qloballaşdırmanın icra və idarə edənə ehtiyacı var. Başqa sözlə desək qloballaşma ilə qloballaşdırmanın təfavütü bundan ibarətdir ki, qloballaşma texnologiyanın inkşafı və iqtisadi şirkətlərin ondan mütəmadi şəkildə istifadə etməsi sayəsində öz apogeyinə

çatmışdır. Halbuki, heç kəsə bu növ texnologiyaları məqsədyönlü ixtira etməsinə sifariş verilməmişdi. Yəni həm ixtirası təbii idi və həm iqtisadi şirkətlərin ondan genişmiqyaslı istifadə etməsi. Lakin bəzi qüvvələr bu özü coşan cərəyanın liderliyini ələ almaq istədikdə, bu tamaha düşdükdə qloballaşdırma prossesi başladı. Milli hökumətləri zəiflətmək və beynəlxalq super dövlət icad etmək qloballaşdırmanın əsas prinsiplərindən idi. Onlar bu ideya ilə təbii şəkildə meydana gələn qloballaşmanı idarə etmək məqsədilə beynəlxalq təşkilatlar və qurumlar təsis etməyə başladılar. Hazırda istemarçılar qloballaşmanı qloballaşdırmaya çevirirlər. Artıq yeni dünya sistemi özünün formalaşma dövrünü keçirir. Lakin özünəməxsus cəhətlərlə səciyyələnən .keçid xarakterli mərhələ bu cərəyanın əsas tərkib hissəsini təşkil edir

Belə qənaətə gəlmək olar ki, hazırda vahid hökumət quruluşu üçün günbəgün hazırlıqlar meydana çıxır. Buradadır ki, möminlərin də vəzifə və məsuliyyətləri üzə çıxır. İNTİZAR anlayışının mənasına nəzər salsaq görərik ki, bəşəriyyətə cəhət vermək lazımdır. Çünki cəmiyyət hazırda uçuruma tərəf gedir. Balla zəhərin təfavütünü başa salmaq lazımdır. Haqqla batili göstərmək kifayətdir. Vəzifəşünas insanlar bu növ hərəkətə başladıqları təqdirdə, vahid İlahi dövlətin qurluşunun reallığına ümidvar ola .bilərik

səh:١٠

Bizim vəzifəmiz bundan ibarətdir ki, qloballaşmanın tərəfində dayanaq və onu müdafiə edək. Amma maddiyyata varan qloballaşdırma ilə mübarizə və bu cərəyanın iç üzünü və mahiyyətini ifşa etməyi də unutmayaq. İlahi dinlərdə olan anadangəlməliklə ümumi faktorları taparaq onları üzə çıxartmalıyıq. Yalnız Məhdəviyyət armanına arxalandığımız təqdirdə ümumbəşəri baxışla İlahi baxıma doğru müvəffəq addım atacağıq. Bizlər İlahi mədəniyyəti dini maariflərdən istixrac .edərək günün dili ilə aktual şəkildə bəşəriyyəti maarifləndirməliyik

# GIRIş

Hazırkı əsrdə bəşəriyyətin düşmənləri aləmdə yanlış fikir və düşüncələri yaymaqla yanaşı, həqiqi vəd edilmiş nicatvericini öz hörümçək toru tipli saraylarına xətərli hesab edərək, Məhdiçilik mədəniyyətini məhv etmək istəyirlər. Nihilizm və puçluq təfəkkürünü yayaraq, bəşərin əxlaqına, mənəvi dəyərlərinə, və gözəl davranışına .hücum edirlər

Məhz bunları nəzərə alaraq, Məhdiçilik həqiqətlərini açıqlamaq məqsədilə vədedilmiş nicatverici barəsində qısa silsiləvi bəhslərə toxunaraq, bu kitabı elm və .fəzilətsevərlərə təqdim edirik

.Müqəddəs Cəmkəran məscidinin nəşriyyatı

.Hüseyn Əhmədi

səh:١٣

## ÖN SÖZ

Qloballaşma çağdaş dünyanın aktual mövzularından biridir. Bir çox alim və mütəfəkkirlər bu predmet barədə kitab və məqalə yazmışlar. Qloballaşmanın müxtəlif sahələri olduğundan ona müxtəlif aspektlərdən yanaşmaq mümkündür. Buna görə də ona çoxlu təriflər verməklə yanaşı, onun haqqında müxtəlif nəzəriyyələr də irəli sürülüb. Əlbəttə bu predmetin formalaşması üçün müxtəlif nəzəriyyə verən alimlərdən bir qismi belə sanırlar ki, bu hadisə zaman və məkanın qısalığı, kütlənin aləmdəki mövzulara agahlığı və texnoloji əlaqələrin inkişafı sayəsində meydana gəlmişdir. Başqa bir sıra alimlər bu əqidəyədirlər ki, qloballaşma imperyalist və istemarçı qüvvələr tərəfindən formula olunuan və başda Amerika olmaqla yanaşı imperyalist və istemarçı dövlətlər tərəfindən icra edilən bir predmetdir. Digər bir qrup isə belə düşünür ki, hazırki həyatda qloballaşma danılmaz və qaçılmaz bir mövzudur. .Məhz buna görə cərəyan və ya proje hesab oluna bilməz

Qüdrət və texnologiya sahiblərinin bu mövzudan daha çox bəhrələnməsinə və dünya miqyasında öz mənfəətlərini güdən təbliğatın genişmiqyaslı və güclü təzyiq göstərməsinə baxmayaraq, qloballaşma bir çox ictimai sahələr üçün, bütün dinlər o cümlədən İslam dini üçün fürsətlər, perspektivlər və potansiyollar meydana gətirmişdir. İndi isə bu məsələyə yeni aspektdən yanaşmaqla yanaşı, bu mövzuya .aydınlıq gətiririk

səh:۱۶

## Qloballaşmaya aid nəzəriyyələr

### İşarə

Qlaballaşmaya aid nəzəriyyələr məzmun və forma baxımından iki hissəyə ayrılır. Forma baxımından bu sual meydana çıxır: ki, görəsən qloballaşma tarixi bir cərəyandır, yoxsa qərbin sərmayədar, liberal sistemi tərəfindən meyana çıxarılan bir projedir ? Başqa sözlə desək, qloballaşma qaçılmaz və danılmaz bir həqiqətdir. Buna .görə cərəyan və ya proje hesab edilə bilməz

Məzmun baxımından qloballaşmanın keyfiyyət və mahiyyətinə nəzər salmaq lazımdır. Bu baxışla əlaqədar müxtəlif fərziyyələr mövcuddur. O cümlədən, dini baxış, modern və liberal demokrat baxışı, neomarksizmin baxışı, post modernizmin baxışı və bu kimi .məktəbləri nümunə gətirmək olar

### Qloballaşmaya formal baxış

:Forma baxımından qloballaşma mövzusuna müxtəlif görüşlər var

səh:۱۷

### Qloballaşma prossesi –١

Tədqiqatçıların bəziləri bu əqidədədirlər ki, qloballaşma tarixi bir cərəyandır. Texnologiya, telefon, televizyon, peyk anteni, internet və bu kimi əlaqələrin inkişafı sayəsində meydana gəlmişdir. Onlara görə bu vasitələr millətlərin mədəniyyətlərinin və dinlərinin bir-birilə yaxından tanışlığına səbəb olmuşdur. Məhz millətlərin bu məsələlərlə tanışlığı, onların ümumbəşəri işlərə daha çox diqqətinə bais olmuşdur. Yalnız bu mövzu qloballaşmanın ٢١-ci əsrdə ictimaiyyət tərəfindən təcrübə edilməsinin əsas səbəbidir. Qeyd olunanların nəticəsindədir ki, ideoloji və mədəni məsələlərə aid müxtəlif millətlər arasında dialoqlar və diskusiyalar açılıb, buna görə vahid, müştərək ideologiya və mədəniyyətə doğru irəliləyirlər. Başqa sözlə desək, texnologiya və rabitənin genişlənməsi dünya millətlərinin dünya işlərinə nisbət agahlığına səbəb .olmuşdur

Bugünkü insan özünün xüsusi və milli maraqlarından əlavə beynəlxalq mövzulara da nəzər salır. Bugünkü ictimaiyyət müştərək bir qurluşun formalaşmasını arzulayır, bəşərin qəbul edəcəyi yeni mədəniyyətin meydana gəlməsini gözləyir. Onun vasitəsilə döyüş, terorizm, ekalogiya, qaçaq və bu kimi ictimaiyyətin problemlərinin aradan qaldırılmasını istəyir. Qeyd olunanların nəticəsində isə yeni dünyanın insana uyğun şəkildə formalaşmasını və qurulmasını arzulayır. (Behruzlək, Siyasət və Məhdəviyyət, (səh ١٢

Bu əsasla belə qənaətə gələ bilərik ki, qloballaşma rabitə və texnologiyanın inkşafının .məhsuludur. Bu da zaman və məkanın sıxıntı və qısalığına səbəb olmuşdur

**Qloballaşma projesi –٢**

Fransıs Fukuyama, Tamilson, Deyvid Hold, Edvard Səid və Roje Qarodi kimi mütəfəkkirlər qloballaşmanı qərb projesi hesab edirlər. Onlara görə qloballaşma qərbin qədim kapitalist, ağ dərili insanın davamlı vəzifəsidir. Avropalılar istəyirlər bütün dünyanı özləri kontrol etsinlər. Qloballaşma qərb istismarının yeni paltarıdır ki, öz qədim istemar proqramlarını onun vasitəsilə örtürlər. Əslində qərb qloballaşdırmasının başında Amerika durur. Bu danılmaz bir faktdır. Qloballaşma bu mənaya dünyanı Amerikalaşdırmaq deməkdir. Başda Amerika olmaqla qərb ölkələri də çalışırlar ki, Amerika, qərb mədəniyyət və dəyərlərini dünyada yaysınlar. Onlar özlərinin döyüşlərindən və acı tarixlərindən ibrət alaraq, başa düşüblər ki, müharıbə, istismar və təcavüzlə bütün dünyanı ələ keçirə bilməyəcəklər. Buna əsasən öz istemarlıqlarını, təbliğat və mədəni təcavüz adlı yeni strategiya ilə dəyişiblər. Onlar inkşaf etmiş informasiya və texnologiya vasitələrindən istifadə edərək, genişmiqyaslı təbliğat və mədəni təcavüzlərin sayəsində, qismən də olsa öz mədəniyyətlərini üstün və dəyərli mədəniyyət kimi bəşəriyyətə tanıtdıra biliblər. Onlar liberalizm və kapitalizm

sistemlərini dünyaya üstün nümunə və örnək kimi çatdırırlar. Konkret olaraq Sovet ittifaqı aradan getdikdən sonra qərbin təbliğatı genişləndi. Onlar bu fürsətdən istifadə edərək dünyaya bildirmək istədilər ki, kapitalizm qurluşu ilə qarşı qarşıya gəlməyə heç bir cərəyanın qüdrəti yoxdur. O qədər qabağa getdilər ki, dünyanın təkqütblüyünü iddia etdilər. Bu ifratçılığa dözə bilməyən yeni tədqiqatçılardan bir çoxu qərb qloballaşdırmasını tənqid atəşinə tutdular. Bu cərəyanın tənqidçilərindən Tamilson, Deyvid Hold, Edvard Səid və Roje Qarodi kimiləri göstərmək olar. Tamilsona görə bu gün dünyada şahidi olduğumuz qloballaşma təbii seyrə və hərc mərcliyə əsaslanmır. Hazırki qloballaşma bəşərin ehtiyac və təcrübələri nəticəsində yaranmayıb. Əksinə qloballaşma hazırda qərb mədəniyyətinin hakim olması ilə vücuda gəlib. (Qloballaşma nədir? Qədir nəsri.) Yəni demək olar ki, Tamilsonun nəzərindən qloballaşma hazırda .qərb mədəniyyətinin qloballaşdırmasından başqa bir şey deyil

Roje Qarodi bu barədə deyir: “Qloballaşdırma elə bir sistemdir ki, qüdrətli insanlar bazar azadlığını iddia etməklə anti insan diktatorlarından bir qrupunu zəif insanlara ”.təhmil edirlər

O açıqcasına qloballaşmanın qərbləşdirmə ilə bərabərliyini iddia edir. Bu isə ancaq Amerikanın mənfəətinədir. Qloballaşma

səh:٢٠

cərəyanı ilə müxalif olan təşkilat və qurumlar hazırda qloballaşmanın belə məna daşıdığını vurğulayırlar. Qloballaşmanın tərəfdarlarından sayılan Fransıs Fukuyama və Samuel Hantington da bu baxışa meyllənib qərb qloballaşdırmasını təyid edirlər. Fukuyama liberalizm və kapitalizm qurluşlarından himayət edərək, bəşəriyyətin inkşaf və səadətə çatması üçün bu sistemi seçməsinə dəvət edir. Onun ideyasına görə hərtərəfli inkşafa çatmaq yalnız bu sistemin sayəsində mümkündür. Qərb sistemi təkcə sistemdir ki, qlobal olma imkanları var. O bu əqidəyə varır ki, liberal demokrat ideologiyanın təkamül nöqtəsi və bəşər hökumətinin forma baxımdan axırıncı (.quruluşudur. (Fransıs Fukuyama, Tarixin sonu və axırıncı insan

Samuel Hantington bu əqidədədir ki, qərb dövlət quruluşu və liberal demokratiya dünyaya hakim olan bəşər hökumətinin axırıncı formasıdır. Qərb mədəniyyəti də aləmə yayılmağa ləyaqəti olan təkcə mədəniyyətdir. Onun baxışına görə bəşəriyyət qərb quruluşuna və mədəniyyətinə meyl etdiyi təqdirdə inkşafa doğru addım (atacaqdır. (Samuel Hantington, sivilizasiyaların toqquşması nəzəriyyəsi, səh: ۱۶

Təbiidir ki, qloballaşmanı bu mənaya götürmək İslamdakı Məhdəviyyət armanı ilə uzlaşmayacaq. Qloballaşmanın tənqidçi, müxaliflərindən bir çoxu bu anlayışı tənqid etmişlər. Onlar həqiqətdə hazırki qloballaşma cərəyanı və qərb hegemonluğu ilə .müxalifdirlər

səh:۲۱

Vahid beynəlmiləl quruluşun bərqərarlığı ilə müxalif deyillər. Məhz buna əsasən bir sıra alimlər qloballaşmanın proje olmasını rədd edirlər. Onlar qloballaşmanı müxtəlif .amillərin nəticəsi kimi xarakterizə edirlər

**Qloballaşma predmeti –٣**

Arcun Apadurya kimi alimlərin bir çoxu bu əqidədədirlər ki, ümumi şəkildə qloballaşma cərəyanını tarixi prosses kimi qələmə vermək düzgün deyil. Onu habelə qərb projesi adı altında da xarakterizə etmək, onun barəsində dolğun fikir söyləmək deyil. Əksinə, hər ikisini qloballaşmanın meydana gəlmə amillərindən hesab etmək lazımdır. Qloballaşma yeni bir hadisədir, beynəlxalq əlaqələrin genişlənməsi, ictimaiyyətin beynəlmiləl işlərə agahlığı, ideologiya, texnologiya və bu kimi müxtəlif amillərin sayəsində meydana gəlibdir. Bu baxışa əsasən qloballaşma bir neçə amilin məhsuludur. Arcun Apadurya özünün məşhur məqaləsində beş əsas amili ad aparmışdır. Onlar texnologiya, ideologiya, sərmayə, milliyyət və rabitə əlaqələrindən ibarətdir. Bütün bunlar qloballaşma cərəyanının sürətlə inkşafında mühüm rol oynamışlar. Məhz bunlara görə qloballaşmanı prosses və ya proje və həmçinin təbii və yaxud bilərəkdən qurma bir şey adlandırmaq olmaz. Əksinə olaraq, onlardan bir hissəsi qloballaşmanın formalaşmasında və digər bir qrupu onun genişlənməsində .mühüm rol oynamışlar

səh:٢٢

## Qloballaşmaya məzmun və mahiyyət cəhətdən yanaşma

**İşarə**

Qloballaşmanın mahiyyəti barəsində müxtəlif nəzəriyyələr verilmişdir. Aşağıda onlardan bəzisini qeyd edirik:

Üçüncü dünya mütəfəkkirlərindən bir çoxu bu əqidədədirlər ki, qloballaşmanın iki növü var:

١- Terminoloji qloballaşma

٢- Həqiqi qloballaşma

Onlar terminoloji qloballaşma ilə həqiqi qloballaşma arasında fərq görür və terminoloji qloballaşmanın kökünü qərbin sərmayədar sistemində görürlər.

Sərmayədar sisteminin tərəfdarları bu qənaədədilər ki, qloballaşma prosesindən daha çox istifadə etməlidirlər. Onlar çalışırlar sərmayədar sistemində mövcud olan iqtisadi, ictimai, teori və epistemoloji ziddiyyətləri həll etsinlər. Onların baxışına əsasən bu növ ziddiyətlər modernizmin zat və mahiyyətində yatır. Humanizm, zəkaya əsaslanmaq və emprizm, sərmayədar qurluşunun qaynaqlarını təşkil edirlər ki, Allahın inkarı ilə nəticələnir. Aydındır ki, Allahın inkarı insanın məqsəd, hədəf və mahiyyətinin inkarı deməkdir. Qeyd olunanlara əsasən terminoloji qloballaşma kamil şəkildə dünyada icra oluna bilməz. Ancaq həqiqi qloballaşma Allaha əsaslanan din sayəsində reallaşa bilər. (İmad Furuğ, Biz və qloballaşma)

Təkcə həqiqi məktəb və dindir ki, qlobal ola bilər. Biz inanırıq ki, qloballaşmaya imkanı

olan təkcə məktəb və din İslamdır. Çünki, xatəmiyyət anlayışının mənası budur. Əgər biz Həzrət Məhəmmədin (s) peyğəmbərlərin sonuncusu olmasına və Ondan sonra heç bir peyğəmbərin gəlməməsinə inanırıqsa, nəticə etibarilə deyə bilərik ki, İslam bütün .zamanlarda bəşəriyyət üçün qlobaldır

Bu açıqlama ilə aydın oldu ki, yalnız kainat və təbiətin Tanrısı ilə uzlaşan qloballaşma prosesinin meydanda qalma imkanı var. Amma İslam dünyasının mütəfəkkiləri və üçüncü dünya alimlərindən bir çoxu qloballaşma qərbin yeni istemar tipli olmasına inanırlar. Məhz buna görə İslam dünyasının mütəfəkkiləri və üçüncü dünya alimləri .qloballaşmaya xoş üz göstərməmişlər

**(Modern baxış (liberal demokrat –١**

Modern termini latın dilindən götürülüb, gündəmdə, cərəyanda olma, keçmə və hərəkət etmə mənasınadır. Modernizm yeni metodlarla işlədildikdə qədim və əski üslubların qarşısında duran mənanı ifadə edir. Modernizm on yeddinci əsrdən başlayaraq, Avropa ictimai təşkilatlarda və həyat üslublarındavücuda gəldi. Sonra tədrici şəkildə dünyada nüfuz etməyə başladı.(Antoni Gidenz, Modernizmin nəticələri, (səh:۴

Gidenzə görə Modernizmin əsas xüsusiyyət və ünsürləri, sekularizm, personalizm, kapitalizm, rasyonalizm, liberal demokrat, və insanmədarlıqdan ibarətdir. O deyir ki, modern insana hər tərəfli azadlığı

qeyd olunan ünsürlər bağışlanmışdır. Məhz buna görə dini ,irqi və fundamental sərhədləri keçərək, hətta Allahı da insanın ictimai və siyasi həyatından təcrid etmişdir. Başqa sözlə desək, modern insan mürtəce kilsə hökumətindən ayrılaraq özünü azad .etmişdir

Modernizmin tərəfdarları elmin və texnalogiyanın inkşafını yuxarıdakı ünsürlərin nəticəsi kimi xarakterizə edirlər. Buna əsasən bir çox qərb alimləri bu əqidədədirlər ki, qloballaşma nəticə etibarı ilə modernizmin məhsuludur. Onlar modernizmin üsulları .əasaında qloballaşma prossesini təhlil və analız edirlər

Gidenz çalışır modernizmin əsas dörd rüknü, yəni, kapitalism, sənətkarlıq, nəzarət və kontrol etmək, konkret olaraq millət və dövlətin siyasi kontrolu ilə onun beynəlxalq kapitalizm iqtisadiyyatı, beynəlmiləl işgüzarlığın bölünməsi, millət və dövlət sistemi və beynəlxalq sistemdən ibarət olan digərcinsli əsas amilləri arasında sıx əlaqələr (yaratsın. (Behruzlək, Siyasət və məhdəviyyət, səh: ۱۵۲

Beynəlxalq sistemə tərəf sürükləyən bəşər ictimaiyyəti Gidenzə görə həmin qloballaşmanın modern olmasıdır. O qloballaşmanı yüksəlmiş modernizm kimi təhlil edir. Modern baxışa əsasən modernizmin yüksək zirvəsi qloballaşmadır. Onlar həqiqətdə qloballaşma prossesini modernizmlə əlaqələndirirlər. Onlar bu prossesi

modernizmin ayrılmaz hissəsi kimi qələmə verirlər. Rabertson qloballaşma prossesini yüksəlmiş və böyümüş modernizm kimi yad etmişdir. O bu əqidədir ki, qloballaşma modernizmlə sıx əlaqədardır. O bu əlaqəni belə izah edir: "Qloballaşma modernizmin məhsuludur." Modernizm fanat və radikal insanlarla üzbəüz idi, buna görə öz ideyalarını reallaşdıra bilmirdilər. Amma sonradan internet və texnologiyanın köməyi sayəsində modernizmin üsullarını dirildərək icra etməyə başladılar. Hətta beynəlxalq səviyyədə onu genişləndirdilər. Qloballaşma humanizm mədəniyyətinin nəticəsidir. Humanizmin özü də modernizmin kökü hesab edilir. Bu baxışa əsasən nəhayət liberal demokratlar bəşər həyatının əsasında köklü rol oynayacaq. Çünki dünyada onun alternativi yoxdur. Fukuyama kimi mütəfəkkirlər də açıqlama veriblər ki, sosiyal komunizm düşüncəsinin soyuq döyüşünün sona çatması liberal demokrat sisteminin alternativsiz qalmasına və qələbəsinə gözəl sübutdur. O buna əsaslanaraq tarixin sonu fərziyyəsini vermişdir. Daqlas həmçinin onun sözünü təsdiqləyərək deyir : "Komunizmin süqutu ilə tarixin bu hissəsi sona çatdı. Qloballaşma ۱۹۹۰-cı ildən bəri kapitalism bazar nümunələrini özünə ülgü seçibdir. Praktik sahədə də cavabsız və rəqibsiz qalıbdır. Belə düşünülür ki, qloballaşmanın iqtisadi inkşafı ilə yanaşı demokratiya da dünyada üstünlüklə

”.nəticələnəcək. Əlbəttə özünün bütün qism, hissə və növləri ilə birlikdə

Qloballaşmanı modernizmlə əlaqələndirən digər mütəfəkkirlərdən biri də Hantingtondur. O ancaq bəşəriyyətin məqbul hesab etdiyi və qalib sandığı dövlətləri demokratik sistemlər sayır. O bu barədə aydın şəkildə açıqlama vermişdir. O deyir ki, ۱۹۷۴-cü ildən ۱۹۹۰-cı ilədək Avropanın şərq və qərbindən tutaraq latınAmerikası, şərqi Asiya və bu kimi ۳۰ dan artıq ölkə digər sistem və qurluşlardan demokratik qurluşa üz tutaraq çeviriliblər. Deməli demokratiya qurluşu beynəlxalq sistem olacaq. Bütün .bəşəriyyət onu qəbul edəcək

**Neomarksizmin baxışı –۲**

Neomarksistlər bu əqidədədirlər ki, hazırda qloballaşmasevərlər yeni texnologiyadan bəhrələnərək, istismarçıların təsəllütünün davam və genişlənməsindən başqa bir şeyə qulluq etmirlər. Bu baxışa əsasən qloballaşma istemarın yeni növüdür. Neomarksist nəzəriyyəçilərinə görə qloballaşmanın sistematik mahiyyəti var ki, onun nəticəsində qərbin kapitalist mədəniyyəti dünyada genişlənəcək. Edvard Səid bu həqiqəti belə işıqlandırır: “ Kapitalist imperiyalizmi qloballaşma vasitəsilə yeni mərhələyə keçmişdir. Qabaqkı mərhələləri kimi digərlərini istemar etmək niyyətindədir”. (Suizi və başqaları, Qloballaşma hansı məqsədlə?) Emanuel Valrstin, Günder Frank, Pol Baran və .başqaları bu cərəyanı qəbul edilməz sayırlar

səh:۲۷

Neomarksistlər inanırlar ki, kapitalizmin qloballaşması həqiqi qloballaşma olmayacaq. Bəşər ictimaiyyəti sonda əsası müsavat və ədalətdən ibarət olan sosiyalizmə doğru üz tutacaqlar. Beynəlxalq komunizm hökuməti qurulacaq. Bu hökumət və dövlətdə hər şey ümumi olacaq. Heç bir şey xüsusi malikiyyətə əsaslanmayacaq. (Tamilson, səh: ٢٨)

**Post modernizmin baxışı –٣**

Laktap və Kitneş kimi qərb mütəfəkkirləri qloballaşmanı post modernizmlə əlaqələndirirlər. Onlar inanırlar ki, qloballaşma cərəyanı modernizm zəminindədir. Lakin beynəlxalq ictimaiyyət post modern cəmiyyətdir. Çünki post modernizmin aydın ünsürlərindən biri çətin və sabit mövzuların münasib və dəyişkən məsələlərə çevirilməsidir. Lak tap post modern cəmiyyətlərdə milli qiyamların süquta doğru getməsi, azlıq təşkil edən dillərin genişmiqyaslı dillər müqabilində sıradan çıxması və bu kimi mövzuları tədqiq etdikdən sonra bu qənaətə gəlib ki, qeyd olunan dəyişmələrin bərabərində azlıq təşkil edən dil və mədəniyyətlər təhdid olunurlar. Qloballaşma ilə üzləşməyə hazırlaşmaq üçün ictimaiyyətin ən mühüm vəzifəsi milli kökləri sındırmaqdır. Əlbəttə bu quruluş sındırmaq, millət və onun dəyərlərini inkar və ya məhv etmək mənasında deyil. Əksinə post modern tələblərlə cəmiyyət və millətin dəyər və mentalitetini uzlaşdırmaqdır. Bu prosses öz

səh:٢٨

həqiqətini tam başa düşdükdə və agahlı şəkildə özünü mövcud və real dünyanın şəraitilə uzlaşdırdıqdan sonra tam nəticə verə bilər. O bu əqidədədir ki, baxmayaraq qloballaşma modernizmlə sıx əlaqədardır, amma beynəlxalq ictimaiyyət ancaq post modernizm zamanında tam mümkün olacaq. Çünki post modernizm cərəyanı hər predmeti mövcud vəziyyətlə uyğunlaşdırmağa qadirdir. Əlbbəttə bu növ qüdrətin mənşəyi post modernizmin məzmun və quruluş xüsusiyyətlərindədir. Onlar :aşağıdakılardan ibarətdir

.Hər növ ideya və əqidənin hərtərəflililiyi və ümumiliyinin inkarı

.İnsan fərdi və ictimaiyyətinin həmrəyliyinin inkarı

İdeologiyanin etibarsızlığını və sona çatmasını elan etmək

.Real və sabit həqiqətin inkarı

.Hər növ epistemologiya və idraka qarşı tənqidlə qarşılaşma

**Qloballaşmanın tarixi qaynaqları**

Qloballaşmanın tarixi köklərini bəşərin tarixi qədər uzaqlara apara bilərik. Sosioloqların və arxeoloqların fikrincə, bəşərin həyatı meşələrdən, mağaralardan, fərdi, ailəvi və məhdud yaşayışdan başlayaraq, tədrici şəkildə bulaqların, çeşmələrin və çayların kənarında el, oba, qəbilə və cəmiyyətə çevrildi. Sonralar kəndlərə və kiçik qəsəbələrə döndü. Daha sonralar şəhərlər, ölkələr və dövlətlər meydana

gəldi. Buna əsasən deyə bilərik ki, ümumilikdə bəşəriyyətin həyatı qloballaşmağa doğru tədrici hərəkətdədir. Deməli qabağa, önə irəlilədiyimiz qədər ayrılıqlar və fərqlər azalır və cəmiyyətlər böyüyür və genişlənir. Əlbəttə bu hərəkət son əsrlərdə daha çox sürətlə inkişaf edir və yeni texnologiya vasitələrindən istifadə etməklə qloballaşmağa .doğru hərəkət daha da şiddətlənəcək

## Məhdəviyyət hakimiyyətinin qərb qloballaşdırmasına münasibəti

Həzrəti Məhdi(ə c)in hökuməti armani hökumət olaraq İlahi göstərişlərə əsaslanır. O hökumətdə bütün insanların ədalət, rahatlıq, xoşbəxtliyi tam formada təmin olacaq. Qeyd olunan hökumət sistemi dünya üçün ideal hökumət qurluşudur. Onun müqabilində qərb qloballaşdırması istəyir qərbin qurluş və mədəniyyətini millətlər arasında yerləşdirsin. Qərb məxsusən Amerika internet, peyk anteni kimi yüksək rabitə qovşaqlarından və texnologiyadan istifadə etməklə dünyanın hakimiyyətini ələ keçitmək üçün çalışırlar. Onlar kapitalist rejimini dünyada hakim etmək istəyirlər. Qərblilər spesifik dahiliklə qloballaşma cərəyanını öz mənfəətləri səmtə meyilləndirirlər. Dünyada yalnız iddia etməklə və öz iddialarını genişləndirməklə bir çox geridə qalmış dövlətləri aldadırlar. Bəşər hüququ, demokratiya, beynəlxalq ,əmniyyəti qoruma qüdrəti, azadlıq, terroristlərlə mübarizə

atom stansiyalarını məhv etmək kimi konsepsiyaları beynəlmiləl səthdə araşdırmaq və açıqlamaqla öz qəhrəmanlıqlarını dünyaya tanıtdırmaq istəyirlər. Amerika və onun muzdurları digər ölkələrə hücüm və təcavüz etmək üçün bəşər hüququ, demokratiya və bu kimi anlayışlardan kömək alırlar. Azadlıq və demokratiyadan müdafiə adı altında Viyetnam, Əfqanıstan və İraqa təcavüz edirlər. Həqiqətdə onlar özlərini dünyanın ağası və sahibi sanırlar. Qloballaşma prossesini də öz mənfəətləri tərəfə sövq edərək, ancaq özlərini düşünürlər. Birləşmiş millətlər təşkilatını da yalnız bu məqsədlə meydana çıxartdılar ki, qlobal hökumətin qurluşu üçün münasib zəmin yaratsın. Göründüyü kimi qüdrət sahibləri Amerika, Fransa, İngiltərə birləşmiş millətlər təşkilatına rəhbərlik edirlər. Veto haqqı yalnız beş ölkənin ixtiyarındadır. Bu onun üçündürki, onların mənafeyilə müxalif olan sağlam düşüncəli insanların verdikləri proqramları yerindəcə boğsunlar. Azadlıq və müstəqillik üçün edilən qiyam və inqilabların üzvləri əgər Amerika və ona dost ölkələr ilə müxalifdirlərsə, onları terorist hesab edilirlər. Amerika üçün onların mənafeyinə zidd olan hər hansı islah və inqilab edənlər teroristdirlər. Aydındır ki, Həzrəti Məhdi(ə c)in qloballaşdırma prossesi qərbin verdiyi ülgü ilə ziddir. Çünki bu acı həqiqət açıqcasına bəşər hüququ və ədalətlə müxalifdir. Hər bir sağlam düşüncəli şəxs bunu dərk edərək öz nifrətini ona bildirir. Bir halda

ki, Həzrəti Məhdi(ə c)in hökumətinin əsas xüsusiyyətlərindən biri ədaləti yer üzündə icra etmək və genişləndirməkdir. Bundan əlavə qərbin qloballaşdırma düşüncəsinin fəlsəfi qaynaqları da Həzrəti Məhdi(ə c)in hökumətinin ideoloji kökləri ilə uzlaşmır. Bu cəhətdən hazırda dünyaya hakim olan qərbrəngli qloballaşmanın uzlaşmayan .tərəflərini İslamdakı Məhdəviyyət ideyası ilə tədqiq və müqayisə etmək yerinə düşər

**Qərb qloballaşdırma əsaslarının tənqidi**

**İşarə**

İslamda mövcud olan Məhdəviyyət konsepsiyası ilə uzlaşmayan qərb təfəkkürünün :əsasları aşağıdakılardan ibarətdir

**(Humanizm (Personalizm –۱**

Qərb mədəniyyətinin teori və əsası humanizm əsasında qurulub. Bir halda ki, İslamda qeyd olunan Məhdəviyyət mövzusu kainatın yaradıcısı,Uca Tanrıya əsaslanaraq, qurulacaq. İnsanmədarlıq bu deməkdir ki, insan təbiətin bir hissəsidir və buna görə var olduqdan sonra davamlı şəkildə bu məsafəni seyr etmişdir. Bildiyimiz kimi bu nəzəriyyə Darvinin təbiət barəsindəki, nəzəriyyəsinin təsiri altındadır. Bəlkə ondan da daha artıq irəliləyərək, deyir: “Hər bir şey hətta fəlsəfə və din dəyişmə qanununa tabedir.” Göründüyü kimi bu təfəkkür tərzi aydın formada insan və təbiətin Ulu Tanrı .tərəfindən yaradılmasını inkar edir

Qeyd olunan insanpərvərlik ideyası hər cür mənəvi dəyərlərdən uzaqdır. Hər şeyə yalnız Maddi yanaşır. Təbiidir ki, bu əsaslandırma İslam dinindəki düşüncə formu ilə qnosoloji cəhətdən uzlaşmayacaq. Çünki, İslam insan və təbiəti Allahın məxluqu sayır. Buna görə insan və təbiətin yaradıcısı insan və təbiəti hər tərəfli əhatə etdiyinə görə, insanın yer üzündə sağlam yaşaması üçün bir sıra qayda qanunlar və göstərişlər vermişdir. Deməli Həzrəti Məhdi(ə c)in beynəlmiləl hökuməti İlahi dəyərlər əsasında qurulacaq. Ancaq bu hökumətdir ki, bəşərin maddi problemlərinə və mənəvi dəyərlərinə hər tərəfli yanaşaraq onları həll edəcək.

**۲– Sekularizm...**

۲– Sekularizm (siyasi və ictimai həyatdan dinin təcrid olunması)

Qərb alimləri dinin dünyəvi və ictimai həyatdan təcrid olunmasına təkid edirlər. Bir halda ki, Məhdi(ə c) in hakimiyyəti idarəçilik ilə dinin birliyinə əsaslanır. İslamın qayda qanunları fərdi yaşayış həyatından əlavə bəşərin dünya miqyaslı ictimai və siyasi yaşayışını da əhatə edir. Aydındır ki, qərbin irəli sürdüyü qloballaşma Məhdəviyyət nəzəriyyəsi ilə uzlaşmayacaq. İslam mədəniyyətində din siyasətin özüdür. Məhz buna görə də onları ayırmaq mümkün deyil. Tarix boyu İlahi peyğəmbər və övliyalar bəşərin mənəviyyatını və daxili dəyərlərini islah etməkdən əlavə ictimai islahat, zülmü aradan qaldırmaq və ədalət kimi dəyərləri də icra etməyə məmur

idilər. Dini siyasətdən ayırmaq bəşəri müxtəlif şəkilli giriftarçılıq və boşluq ilə üzbəüz edib. Amma Həzrəti Məhdi(ə c)in beynəlxalq dövləti dini hökumətə əsaslanaraq, Uca .Tanrının hökmlərini icra edəcək

**(Liberalism (Qeyd bəndsiz azadlıq –۳**

Liberalizm hazırkı qərbin qeyd bəndsiz azadlığını insana bağışlayıb. Buna əsasən dinin, dövlətin və sair qüvvələrin qanun çərçivəsində hər hansısa bir azadlığı insandan almağa haqqı yoxdur. Hər bir şəxs sərbəst azadlıqla öz istəklərini həll edə bilər. Bu nəzəriyyə fərdi və ictimai həyatda din və dövlətin az rol oynaması ilə nəticələnir. Həmçinin müxtəlif təbəqələrin arasında boşluqların genişlənməsinə kömək edir. Qeyd olunan mövzu Məhdəviyyət proqramı ilə də uzlaşmayan bir cərəyandır. Məhdəviyyət nəzəriyyəsi bəşəriyyəti həqiqi səadət, mənəviyyat və fəzilətə dəvət edir. İnsanın azadlığını mənəvi dəyərlər və fəzilətlər çərçivəsində formulə edir. Məhdəviyyət ideyası həqiqətdə insan azadlığı ilə ziddiyyətlənmir. Çünki Tanrı insanı azad və ixtiyarlı mövcud xəlq etmişdir. Əlbəttə Məhdəviyyət ideologiyasına görə insanın azadlığı bu mənaya deyildir ki, istədiyi hər işi edə bilər. Bu əxlaqi çərçivədə olmalıdır. Məsələn, digərlərinin azadlığına xələl gətirə bilməz və ya bir sıra insanların məhv etməyi planlaşdıra bilməz. İnsan azadlığı bu mənayadır ki, insan özünü Allahdan başqa heç

bir şəxsin önündə qul deyil və özünü nəfsin çirkinliklərindən, məqampərəstlikdən və sairdən azad etməlidir. Məhz buna rəğmən hər şəxs həyatda azad və ixtiyarlı şəkildə düzgün yolu seçib, ona əsasən irəli gedə bilər. Amma qərbin liberalizm cərəyanı bu mənaya olan azadlığı məqbul hesab etmir. Ancaq məsuliyyətsiz və Qeyd bəndsiz azadlığa inanır. Halbuki, azadlığı bu mənaya qəbul etmək digər insanların azadlıqlarını məhdudlaşdırmaqdan əlavə onlara zülm etmək kimi özünü təzahür edir. Deməli qərbin qloballaşmasının əsaslarından hesab edilən liberalizm İslamdakı Məhdəviyyət .reallığı ilə uyğun gəlmir

**Empirizm və sensualizm –۴**

Qərb təfəkkürünün əsaslarından biri də hiss və təcrübəyə varmaqdır. Empirizm və sensualizm bu əqidədədir ki, hər şey yalnız hiss və təcrübə metodu ilə isbat olunduğu təqdirdə həqiqi və elmi olur. Başqa sözlə desək qərb düşüncə tərzi məhz əql və təcrübə əsasında qurulub. Lakin Məhdəviyyət ideyası zəkadan əlavə vəhy və İlahi maarifə də əsaslanır. Təbiidir ki, qərb filosofları varlığa yalnız maddi aspektdən yanaşdıqlarına görə metafiziki, maddi varlıqların arxasındakı mövcudları inkar edirlər. Bu cəhətdən də qərbin irəli sürdüyü qloballaşdırma Məhdəviyyət ideyası ilə uzlaşmır. Üstəlik qərb qloballaşdırması qeyri qərb dövlətlərini istemar və istismar eməklə

nəticələnib. Onların inkşaf etmiş texnologiyalara təsəllütü onların təkəbbür və eqoistliklərinə səbəb olur. Məhz buna görə də öz liderlik iddialarını beynəlxalq aləmə elan edirlər. Qərb hegemonluğu bütün aləmi tutur. Bir haldaki İslamda irəli sürülən Məhdəviyyət versiyası bütün el, oba, qəbilə, şəhər və dövlətlərdə ədalətin genişlənməsinə təkid edir. Məhdəviyyət mədəniyyətində insanlar qərb, şərq, şimal və cənubda yaşamaqlarından asılı olmayaraq eyni hüquqa malikdirlər. Onların hamısı Allahın bəndələridir. Şərq və qərb, rəng və milliyyət bəşər arasında üstünlüyə səbəb olmamalıdır. Habelə əgər qloballaşma dünyada kapitalist dövlətlərinin hegemonluğuna səbəb olarsa yenə də Məhdəviyyət armanı ilə uzlaşmayacaq. Çünki, qərb kapitalizmi ancaq daha çox mənfəət əldə etməyə əsaslanır. Buda bəşəriyyətə zülm etməyə səbəb olur. Mənfəət və sərvət ancaq bir sıra insanların ixtiyarında olur. Bir çox insan cəmiyyətləri ondan məhrum edilirlər. Amma İslamın irəli sürdüyü Məhdəviyyət variantında mənfəət və sərvət bütün insan ictimaiyyətinin ixtiyarında qoyulacaq. Əlbəttə İslam baxımından iqtisad və pul yalnız dünya və axirət səadətinə çatmaq üçün bəşərin ehtiyaclarını təmin etmək üçündür. İslam öyrədir ki, Tanrı insanı təkcə dünya üçün yaratmamışdır. Real aləm be dünya deyil. İnsanın həqiqi səadəti :gələcək dünyadadır. Bu haqda Quran deyir

"وإنّ الدارالأخره لهی الحیوان لو کانوا یعلمون"

(Axirət dünyası şübhəsiz ki, əbədi həyatdır. Kaş biləydilər." (Ənkəbut : ۶۴"

Aydın oldu ki, qloballaşmanı əgər qərb qloballaşdırması məzmununa tutsaq Məhdəviyyət armanı ilə uzlaşmayacaq. Amma əgər qloballaşma qərb anlayışından çıxıb, beynəlxalq həmkarlıq və əməkdaşlıq mənası daşıyarsa, və vahid beynəlmiləl hökumətin qurluşu ilə nəticələnərsə, Məhdəviyyət məfhumu ilə uyğunlaşmaqdan əlavə Həzrəti Məhdi(ə c) in vahid hökumətinin əsas amillərindən biri kimi də vurğulana bilər. Çünki, yalnız bəşəriyyətin məsləhət və zərərləri əsasında beynəlmiləl dövlətin mövcud varlığını təsəvvür etmək mümkündür. İnsanın həqiqi məsləhət və zərərlərini təkcə, tam şəkildə onu xəlq edən varlığın agahlığına görə ondan başqa heç bir mövcudun vahid aləmi idarə etməyə ləyaqəti yoxdur. Özünü Allahdan başqa hər şeydən azad edən şəxs təkcə bu böyük məsuliyyəti öhdəçiliyinə götürə bilər. Başqa sözlə desək, vahid hökumətin lideri digər bəndələrdən üstün, Tanrıya yaxın və İlahi insan olmalıdır. İşlərində yalnız Allahı nəzərdə tutmalı və onun üçün hərəkət etməlidir. O İlahi şəxsiyyət dini rəvayətlərdə gələn nicatverici Məhdi (ə c)dən başqa bir şəxs .deyil

Qloballaşma cərəyanı dini və ictimai fürsətlər və perspektivlər gətirməklə yanaşı, o sahələrdə problemlər də yarada bilər. Bu predmet qeyd olunan prossesin keyfiyyət və mahiyyətini olduğu kimi dəyərləndirməyə və xarakterizə etməyə bağlıdır. Qloballaşma bir tərəfdən din və dövlətin rolunu ictimaiyyətdə kəmrəng edir, digər tərəfdən isə .beynəlxalq aləmdə dini ideyaların genişlənməsi üçün yüksək zəmin yaradır

Qloballaşma iqtisadi cəhətdən də fürsətlər və potansiallar gündəmə gətirir. Məhz buna görə bir sıra mütəfəkkirlər bu əqidədədirlər ki, qloballaşmanın həm mənfi və həm müsbət nəticələri var. Şərq mütəfəkkiri Sasakumişo deyir : Qloballaşma elə bir predmetdir ki, öz-özlüyündə ziddiyyətlə nəticələnir. Ancaq ona müxtəlif aspektlərdən yanaşmaqla ayrılıq, fərqlilik və oxşarlıq, eynicinslilik əldə edə bilərik. (Sasakumişo, (.Qloballaşmanın paradoksu, ayrılıqlar və eyniliklər

Onun nəzərinə görə qloballaşma bu cəhətdən mənfidir ki, ictimaiyyətdə ixtilaf, ayrılıq və rəngarəngliyə səbəb olur. Qloballaşma bəşər ictimaiyyətini, beynəlxalq aləmdə öz üstünlüyünü və fərqliliyini göstərməyə sövq verir. Bu isə qüdrət və texnologiya sahiblərinin xeyrinə və inkşafda olan və üçüncü dünya sayılan ölkələrin zərərinədir. Amma bu tərəfdən müsbətdir ki, cəmiyyətlər arası oxşarlığın və eyniliyin

zəminini hazırlayır. Əlbəttə yenidən təkrar edirəm ki, bu bəşərin qloballaşmadan olan .təfsir və baxışına bağlıdır

## Qloballaşmanın mənfi tərəfləri

Qloballaşma baxmayaraq ki, təbii, tədrici və inkşafa doğru gedən bir prossesdir. Yeni əsrdə də bir çox elmi, iqtisadi və teknoloji nailiyyətlər əldə edibdir. Amma eyni halda mənfi effeklərlə də özünü büruzə vermişdir. Aşağıda onun mənfi tərəflərinin bir :qismini qeyd edirik

Beynəlxalq aləmdə təsiredici vahid rəhbərin olmaması və rəqabət adı altında – ۱ .düşmənçiliklərin artması

Fəsadın, məsuliyyətsizliyin və Avropanın aşağı sitilli mədəniyyətinin genişlənməsi, – ۲ .bu cərəyanın nəticəsində də əxlaqi və mənəvi dəyərlərin aradan getməsi

.Bir çox ölkələrdə iqtisadi bərabərsizliyin meydana gəlməsi –۳

Məişət işlərində bir çox mexaniki cihazların tez və sürətlə inkşafı nəticəsində, – ۴ .işsizliyin genişmiqyaslı artması

Cinayətlərin və quldurluqların qloballaşması, məs: qadın, uşaq və narkotik – ۵ .maddələrin qaçağı, həmçinin spid kimi xəstəliklərin genişlənməsi

Digər millətlərin mədəniyyətlərini aradan qaldırmaq və məhv etmək metodu ilə, – ۶ Avropa mədəniyyətinin digər mədəniyyətləri təsir altına salması və qərb .mədəniyyətini onların alternativi qərar verməsi

**Dini qaynaqlarda qloballaşma**

**İşarə**

Quranda və islam dinin də olan mötəbər qaynaqlarda qloballaşma və qloballaşdırma mövzusuna çoxlu işarə olunubdur. Aydındır ki bu predmetin İslamda olan mənası və anlayışı, qərbdə işlənən məna və anlayışı ilə tam fərqlidir. Göründüyü kimi, əgər qloballaşma təbii şəkildə irəliləyərsə, İslamın dünyəvi, beynəl-xalq dövlət tanıtdırdığı mövzuya kömək edəcək. İndi isə bu mövzuya işarə edən bir sıra ayə və hədisləri :təqdim edirik

**A– Müqəddəs Quranda Beynəl–xalq dövlət**

"ولقد كتبنا فی الزبورمن بعد الذکر أنّ الارض یرثها عبادی الصالحون"

Biz Tövratdan sonra Zəburda da yalnız Mənim saleh bəndələrimin yer üzündə varis “ (olacaqlarını yazmışdıq. ” (Ənbiya: ۱۰۵

"وعد الله الذین آمنوا منکم وعملوالصالحات لیستخلفنّهم فی الارض کما استخلف الذین من قبلهم ولیمکّنن لهم دینهم الذی ارتضی لهم ولیبدّلنّهم من بعد خوفهم أمناً..."

Allah aranızdan iman gətirib yaxşı işlər görənlərə, onları özlərindən əvvəlkilər kimi yer“ üzünün varisləri edəcəyini, möminlər üçün onların Allahın özü bəyəndiyi dinini (İslamı) möhkəmləndirəcəyini və onların qorxusunu sonra əmin-amanlıqla, arxayınçılıqla əvəz (edəcəyini vəd buyurmuşdur.” (Nur: ۵۵

"هو الذی أرسل رسوله بالهدی ودین الحق لیظهره علی الدین کله ولو کره المشرکون."

Müşriklərin xoşuna gəlməsə də, İslamın bütün dinlərdən üstün olduğunu göstərmək“ üçün öz Peyğəmbərini doğru yolu göstərən rəhbərlə (Quranla) və haqq dinlə göndərən (Odur.” (Səff : ۹

Bəzi hədislərdə gəlibdir, Həzrət Əli(ə) qeyd olunan ayəni tilavət edərkən öz

səhabələrindən soruşdu: Sizlərin fikrincə bu qələbə hasil olubdur? Dedilər : Bəli. Həzrət buyurdu: Yox, And olsun o kəsəki canım onun əlindədir, bu qələbə yalnız o zaman üzə çıxacaq ki yer üzündə abadlıq qalmayacaq.(Məcməül- bəyan kitabında , qeyd olunan ayənin təfsirində gətirilib.)

**B– Mötəbər hədislərdə Beynəlxalq dövlət**

١ – Hakim nişaburi öz sənədilə əbu Səid Xedridən rəvayət edir ki, Allahın rəsulu (s)buyurdu:

"تملا الأرض جوراً وظلماً فيخرج رجل من عترتي يملك الارض سبعاً وتسعاً فيملا الارض قسطاً وعدلاً"

“Yer zülmlə dolan təqdirdə, mənim əhli beytimdən bir şəxs çıxar və yeddi ya doqquz gün müddətində bütün dünyanın sahibi olar. Yalnız bu zamandır ki, yer ədalətlə dolacaq.”(Müstədrəke Hakim, c ۴, s ۵۵۸)

٢ – Əhməd ibn Hənbəl öz sənədilə Əbu Səid Xedridən nəql edir ki, Allahın rəsulu (s) buyurdu:

"لا- تقوم الساعه حتى تملا الارض ظلماً و عـدواناً. قال: ثم يخرج رجل من عترتي من اهل بيتي يملاها قسطاً و عـدلاً كما ملئت ظلماً و عدواناً"

“ Yer ədalətlə dolmadan qiyamət bərpa olmayacaq, (Bu zaman) buyurdu: o vaxt əhli beyt və itrətimdən bir şəxs çıxar, zülmlə dolu olan yer üzünü ədalətlə doldurar.” (Müsnədi Əhməd, c ٣, s ١٧) )

٣- İmam baqir (ə) buyurdu :

"يملك القآئم ثلاثمائه سنه ويزداد تسعاً كما لبث أهل الكهف في كهفهم، يملأ الأرض عـدلاً و قسطاً كما ملئت ظلماً وجوراً فيفتح الله له شرق الأرض وغربها. و يقتل الناس حتى لا يبقى الا دين محمـد و يسير بسيره سليمان بن داود و يـدعو الشمس والقمر فيجيبانه وتطوى له الارض ويوحى اليه فيعمل بالوحي بأمرالله"

“İmam Zaman (ə c) ٣٠٩ il yer üzünün maliki və

hakimi olacaq, düz Əshabi kəhfin öz mağarasında qaldığı müddət qədər, o vaxt yer zülmlə dolduğu kimi ədalətlə dolacaq. Uca Tanrı onun üçün aləmin şərq və qərbini fəth edər. O təkcə Məhəmməd dininin yer üzündə bərqərar olması üçün, camaatı öldürər. O Davud oğlu Süleymanın davranışı kimi rəftar edər. Günəş və ayı çağırar, onların ikisi də onun dəvətini qəbul edərlər. Ona vəhy olunar və O da Tanrının əmrilə ona əməl (edər." (Bəharul-ənvar, c ۵۲, s ۳۹۰, bab ۲۷, hədis ۲۱۲

**...İslam qloballaşma və**

İslam qloballaşma və qloballaşdırmasının üstünlüklər

Qeyd olunduğu kimi İslamın irəli sürdüyü qloballaşma və qloballaşdırma prossesi, digərlərinin təsvir etdikləri prosseslə əsas fərqlərə malikdir. Aydındır ki, İslamın verdiyi proqram spesifik üstünlüklərə və özünə məxsus əhəmiyyətə malikdir. Aşağıda :onlardan bir qisminə işarə edirik

İslamın beynəlxalq vahid hökuməti səlahiyyətli, məsum, yüksək dini titullu - ۱ şəxsiyyətlərin rəhbərliyi və nəzarəti altında idarə olunacaq. Belə bir cəmiyyətdə Allahın qanunu icra olunacaq. Göründüyü kimi qərbin irəli sürdüyü beynəlxalq vahid hökumət isə zülmkarların, qüdrətlilərin, güclülərin və ləyaqətsizlərin nəzarəti altında .olacaq

İslam nöqteyi nəzərindən ictimaiyyətin bütün işlərinin kökündə Tanrı və onun - ۲ qanunları dayanmalıdır. Amma qərbin gətirdiyi qloballaşma və qloballaşdırmanın arxasında bəşərin qoyduğu və qurduğu

.qanunlar durur

İmam Zamanın(ə c) beynəlxalq hökuməti ictimai, əxlaqi əmin-amanlıqla nəticələnir. -۳ .Bir haldaki, qərbin irəli sürdüyü faktorda mənəviyyatın heç bir rolu yoxdur

İmam zaman(ə c)-ın beynəlmiləl hökumətinin xüsusiyyətlərindən biri elmi dairələrin -۴ genişlənməsidir. Bir haldaki, qərbin gətirdiyi qloballaşma prossesində yüksək bilik və elmi sistemlər yanız məxsus ölkələrin inhisarındadır və qeyd olunan ölkələr bunların digər ölkələrə getməyinin qarşısını alırlar və bu ölkələrdə inkişafla mübarizə edirlər. (.(Bəharul-Ənvar, c ۵۲, s ۳۳۶

İmam Zaman(ə.c)-ın dünyəvi hökuməti həqiqi və dini biliklərə əsaslanır bir halda ki, -۵ qloballaşma, imperiyalizm sistemlərilə əlaqədar olan iqtisadiyyatın, siyasətin və .texnologiyanın aydın və qeyri aydın nəticəsidir

Məhdi(ə c)in ümumdünya vahid dövləti Tanrıya əsaslanır və öz məşruiyyətini - ۶ Allahdan alır. Lakin kütlənin qəbul və razılığını da özü ilə gətirir. Amma qloballaşma öz məşruiyyətini yalnız camaatın razılığından ələ gətirir. Əlbəttə aydındır ki, rəy və səs .gətirmək üçün min cür hoqqabazlıq və aldatma üslublarından istifadə edirlər

.İmam zaman(ə c)-ın bütöv dünyəvi dövləti zəkaya əsaslanan hökumət növüdür -۷

Çünki zühur əsrində əql insanları kəmala çatdırar. Lakin göründüyü kimi qloballaşdırmaya əsaslanan hökumət stili emosiyaya, heyvani meyillərə və nəfsani .istəklərə əsaslanaraq qurulur

:İmam Baqir(ə) rəvayətdə buyurur

"إذا قام قائمنا وضع يده على رؤوس العباد فجمع بها عقولهم"

Bizim İmamımız inqilab edən vaxt Uca Tanrı əlini bəndələrinin başına çəkər. Onun" ( vasitəsilə onların əql və zəkası kamilləşər." (Bəharul-Ənvar, c ۵۲, s ۳۲۸, h ۴۷

İmam Zaman(ə c)in vahid hakimiyyətində bəşərdə əql və zəkanın genişlənməsi - ۸ nəticəsində bütün iqtisadi zərfiyyətlər kəşf olunacaq və təbiətin sərmayəsi insanların ixtiyarında olacaq, bir haldaki, dünyaya hakim olan mövcud iqtisadi sistemlərdə (dəhşətləndirici şəkildə iqtisadi boşluqlar var. (Bəharul-Ənvar, c ۵۲, s ۳۳۸, h ۸۳

Əmirəl-Möminin Əli(ə)ın hədisinə əsasən İmam Zamanın hökuməti zamanında - ۹ möminlər onun ətrafında toplaşarlar və onun hökuməti vaxtında ikiüzlü, fasiq, facir, ( kafir və bunlar kimi kəslərdən əsər-əlamət olmaz. (Bəharul-Ənvar, c ۵۲, s ۳۴۲

Bildiyimiz kimi qərbin qloballaşdırma prossesində həqiqi insanların yeri yoxdur. Hakimlər və qüdrətli insanların ətrafını məsuliyyətsiz , şərəfsiz və çirkinmənəviyyatlı .kəslər tutmuşlar

İmam Zaman(ə c)ın hökuməti müddətində zülmkarlar və tağutlar pis cəza - ۱۰ olunacaqlar.(Nəhcül-bəlağə, ۱۳۸-ci xütbə) Çünki, O həzrətin dövlət quruluşu yalnız

ədalət əsasında idarə olunacaq. Amma qloballaşma və qloballaşdırma əsrində məsələ tamamilə əksinədir. Zalım və cinayətkarlara İslahçı adı verilir, ədalətsevərləri terorist .adlandırırlar

Qloballaşma predmetinin müxtəlif qlobal sahələrdə sürətlə inkşafa doğru hərəkət -۱۱ etməsinə baxmayaraq, qaranlıq, qapalı və tam şəkildə aydın olmayan bir predmetdir. Jan Mari Gino bu barədə yazır : " Qloballaşma təcrübəsində bəşərin ictimai vəziyyəti nagəhan göz ələ gətirən və görən, kor şəxslə müqayisə ediləsidir. Fərdin qloballaşma prossesi ilə vasitəsiz üzləşməsi məstedicidir." (Azadlığın gələcəyi, səh: ۱۷) Amma Həzrəti Məhdi(ə c)in beynəlxalq dövlətinin təsviri aydın şəkildə hədis və rəvayətlərdə açıqlanıb. Bu dövlətin hər tərəfliyi, işəyarıması və xüsusiyyətləri tam, diqqətli şəkildə təsvir olunmuşdur. Məhz buna görə o dövlət barəsində qaranlıq və ya naqis bir məsələ .qalmamışdır

Qərbin qloballaşdırması həqiqətdə iqtisadi və siyasi sahələrdə Amerika və - ۱۲ Avropanın üstünlüyüilə nəticələnir. Öz sayəsində isə düşmənpərvər davranış və əmniyyətsizlik gətirir. Buna görə də heç bir azad düşüncəli millət onu qəbul etmir. Lakin Həzrəti Məhdi(ə c)in əsas proqramı kainatdan zülm və döyüşü qaldırmaq və onu sülh, əmin- əmanlıq və rahatlıq ilə doldurmaq və genişləndirməkdir. Yəni ictimaiyyətin qorxusu rahatlıq və əmin- əmanlığa çeviriləcəkdir. Bu

:haqda Quran buyurur

"وليبدّلنّهم من بعد خوفهم أمناً"

Allah) Onların qorxusunu sonra əmin-əmanlıqla, arxayınçılıqla əvəz edəcəyini vəd)“ (buyurmuşdur.” (Nur surəsi, Ayə ۵۵

Mədəni və ictimai baxımdan qloballaşma bəşər mədəniyyətlərinin yaxınlığını və - ۱۳ eyniləşməsini iddia edir. Lakin göründüyü kimi bu iddiaçılarn əksinə olaraq vahidlik meydana çıxmayacaq, köklü qarşıdurmadan sonra yeni mədəniyyətlər və sivilizasiyalar əmələ gələcək və dünyanın çehrəsini dəyişdirəcək. Bu prossesin nəticəsində mədəniyyət və sivilizasiyaların təzad və döyüşü başlayaraq, əmniyyətsizliyə doğru yönələcək. Bir haldaki, Həzrəti Məhdi(ə.c)in zühuru zamanı siyasi və mədəni ixtilaflardan və mədəniyyətlərin istilasından əsər əlamət olmayacaq. Cəmiyyət və kütlə öz seçimi əsasında vahid din və mədəniyyəti qəbul edəcəklər. Məhz .bunun sayəsində rahat və asudəxatir yaşayacaqlar

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ٩

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ٢٠٠۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.١

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.٢ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .٣ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.١

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲
.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳
.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴
.Nəşriyyatın mənbələrini qeyd etmək.۵
.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir
:Müəssisənin fəaliyyəti
.Kitabların çapı və nəşri.۱
.Kitab oxumaq müsabiqələrinin təşkili.۲
.Məcazi sərgilərin istehsalı.۳
.Kompüter oyunlarının istehsalı.۴
Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵
.Sərgi məhsullarının və moizələrin istehsalı.۶
.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷
.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸
.Təlim kurslarının həyata keçirilməsi.۹
Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰
Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı
JAVA.۱
ANDROID.۲
EPUB.۳
CHM.۴
PDF.۵
HTML.۶
CHM.۷
GHB.۸
.v.Qaimiyyə kitab bazarı adına dörd market
ANDROID.۱
IOS.۲
WINDOWS PHONE.۳
WINDOWS.۴
deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹